UOT: 339.7

# AZƏRBAYCAN RESPUBLİKASININ BEYNƏLXALQ VALYUTA FONDU İLƏ MÜASİR ƏLAQƏLƏRİNİN TƏHLİLİ

**E.Z. ORUCOV**
**Azərbaycan Universiteti**

*Məqalədə müstəqillik qazandıqdan sonra Azərbaycan Respublikasının Beynəlxalq Valyuta Fondu ilə əlaqələrinin inkişaf dinamikası araşdırılmışdır. Bir müddət əlaqələr hərtərəfli artan istiqamətdə inkişaf etsə də, 2006-ci ildən sonra Azərbaycan Respublikasının BVF-dən kredit almayaraq, yalnız məsləhət və texniki sahədə əməkdaşlığa üstünlük verməsi əlaqələrin zəifləməsi kimi qiymətləndirilir. Eyni zamanda, ölkəmizin BVF-nin geniş imkanlarından faydalanması üçün müəyyən təkliflər irəli sürülmüşdür.*

***Açar sözləri:*** *Azərbaycan və BVF, ikitərəfli əməkdaşlıq, çoxtərəfli əməkdaşlıq, BVF-nin kredit siyasəti, iqtisadi artım.*

Azərbaycanın Beynəlxalq Valyuta Fondu ilə 1992-ci ildən üzvlüyünə qəbul olandan indiyədək əməkdaşlığı daima artan istiqamətdə getmişdir. Üzv olduğu vaxtdan Azərbaycanın bu qurumdakı kvotası 1999-cu ildə artaraq 160.9 milyon SDR (1 SDR = 1.37941 ABŞ dolları) və yaxud XHH-a (225 milyon dollar) çatmışdır. Başqa sözlə, BVF-nin ümumi kvotasının 0, 07%-i, səs hüququ isə 2346 və ya ümumi səslərin 0, 09%-i həcmindədir. Təbii ki, müstəqil iqtisadi siyasətə malik bir dövlət kimi respublikamızın iqtisadi vəziyyəti stabilləşdirmək və inkişafı bərpa etmək üçün fondun dəstəyindən istifadə olunması çox önəmli idi. Ona görə də fonda üzv kimi daxil olmağın çox böyük əhəmiyyəti vardır. Müstəqilliyin bərpa olunması dövründə BVF-nin maliyyə dəstəyi ilə aparılmış struktur islahatları proqramı daxili və xarici balansın tarazlaşdırılması və iqtisadi sabitliyin təmin edilməsinə töhfə vermişdir. BVF kimi əhəmiyyətli bir beynəlxalq maliyyə qurumu ilə Azərbaycan Respublikasının əlaqələrinin daima yüksələn xətlə inkişafda olmasına xüsusi diqqət yetirmək lazımdır. Bu qurum təkcə beynəlxalq maliyyə qurumu kimi deyil, eyni zamanda qlobal iqtisadi və siyasi qurum kimi Azərbaycan Respublikası üçün çox əhəmiyyətlidir.

**Müasir əməkdaşlıq istiqamətləri.** BVF ilə Azərbaycan Hökuməti arasında Maddələr Sazişinin IV Maddəsinə uyğun olaraq bu günə kimi Azərbaycan hökumətinin iqtisadi proqramlarının həyata keçirilməsinin dəstəklənməsinə təqdim edilmiş maliyyə yardımları ilə yanaşı, BVF texniki yardım, institusional və monetar idarə etmədə potensialın artırılması üzrə bir sıra sahələrdə, o cümlədən dövlət xərclərinin idarə olunması, vergi-gömrük siyasəti və idarə olunması, mərkəzi bankçılıq, bank nəzarəti, pul siyasəti və statistika sahələrində texniki yardımlar da göstərmişdir. Azərbaycan makroiqtisadi təhlillər və siyasət, maliyyə proqramlaşdırılması, fiskal siyasət və idarəçilik, mərkəzi bank mühasibatlığı və bank nəzarəti sahələrində BVF tərəfindən təmin edilmiş təlimlərdən faydalanmışdır.

Bundan əlavə, BVF ilə əməkdaşlıq çərçivəsində bank nəzarəti çərçivəsinin gücləndirilməsi məqsədilə tənzimləyici normativ aktların və likvidlik normalarının təhlil edilməsi, likvidlik tələblərinin təkmilləşdirilməsi üzrə tövsiyələrin verilməsi, nəzarət təcrübəsi, həmçinin çirkli pulların yuyulması və terrorizmin maliyyələşdirilməsinin qarşısının alınması, bu sahədə bank nəzarətinin gücləndirilməsi, pul və məzənnə siyasəti çərçivəsinin təkmilləşdirilməsi, orta müddətli perspektivdə sərbəst üzən məzənnə rejiminə keçid, həmçinin, Mərkəzi Bankın monetar, makroiqtisadi, real və xarici sektorlar üzrə statistik göstəricilərdəki kəmiyyət və keyfiyyət meyarlarının artırılması, statistik proseslərin formalaşması işini təkmilləşdirilməsi üzrə məsləhət xidmətinin göstərilməsi məqsədilə BVF-nin missiyasının səfərləri mütəmadi təşkil olunur [1, s. 76-77].

Beynəlxalq Valyuta Fondunun əsas məqsədi inkişaf etməkdə olan ölkələrin iqtisadi inkişafını dəstəkləməkdir. Eyni zamanda, ölkənin iqtisadi inkişafında beynəlxalq maliyyə institutlarının, eləcə də Beynəlxalq Valyuta Fondunun rolu əvəzedilməzdir. Xüsusən də, Azərbaycan kimi keçid şəraitində olan ölkələr üçün bu daha vacibdir. Təkcə BVF tərəfindən 1995-2001-ci illərdə Azərbaycana ayrılmış kreditlərin ölkədə nə dərəcədə iqtisadi-maliyyə sabitliyi yaratdığını nəzərdən keçirmək bəs edər. Həmin dövrdə BVF tərəfindən ayrılan maliyyə və digər yardımlar Azərbaycan iqtisadiyyatının planlı Sovet sistemindən tələb və təklif əsasında formalaşan kapital münasibətlərinə keçməsini təmin etdi [5, s. 294-295].

**BVF tərəfindən Azərbaycana ayrılan kreditlər.** Azərbaycanın BVF-dən aldığı kreditləşmə mexanizmləri aşağıdakı cədvəldə daha aydın verilmişdir [7].

**Azərbaycan-BVF: Kredit razılaşdırılması tarixi 01 may 1984-cü ildən 31 mart 2015-ci ilədək (Mln SDR-lə )**

| Kreditləşmə mexanizmi | Razılaşma tarixi | Müddəti (Son tarix) | Razılaşdırılmış məbləğ | İstifadə edilmiş məbləğ | Nominal dəyəri |
|---|---|---|---|---|---|
| Genişləndirilmiş kredit | 06.07.2001 | 04.07.2005 | 67, 580 | 54, 710 | 16, 731 |
| Genişləndirilmiş kredit | 20.12.1996 | 19.03.2000 | 93, 600 | 81, 900 | 0 |
| Genişləndirilmiş kredit | 20.12.1996 | 19.03.2000 | 58, 500 | 53, 240 | 0 |
| Stend-bay krediti | 17.10.1995 | 16.10.1996 | 58, 500 | 58, 500 | 0 |
| Cəmi | | | 278, 180 | 248, 350 | 16, 731 |

**Mənbə: Azərbaycan Respublikası Mərkəzi Bankının internet saytı-www.cbar.az**

**Müstəqil valyuta-kredit siyasəti.** İqtisadi tarixdə Azərbaycanın istəyindən asılı olmayaraq, 1994-cü il hiper inflyasiya ili kimi yadda qaldı. İnflyasiyanın 1800 % qədər çatmasından sonra BVF-in köməyi ilə tətbiq edilən Ümummilli liderimiz Heydər Əliyev və onun davamçısı İlham Əliyev tərəfindən aparılan uğurlu siyasət nəticəsində 2000 ci ildən sonra inflyasiya 5-10% həddinə qədər azaldı [1, s. 63]. Azərbaycan Respublikası Mərkəzi Bankı tərəfindən ölkəmizdə makroiqtisadi sabitliyin təmin edilməsinə, iqtisadi tərəqqinin təminatına, işsizliyin azaldılmasına, inflyasiyanın məqbul səviyyədə saxlanılmasına, yönəlmiş pul-kredit siyasəti yeridilmişdir. Ümumiyyətlə, Azərbaycanda pul-kredit siyasətinin əsasını inflyasiyanın idarə olunması təşkil edir. Bu isə ölkədə iqtisadi inkişaf proseslərinin sürətlənməsinə, sosial-iqtisadi durumun, daha da yaxşılaşmasına, yerli istehsalçıların mənafelərinin qorunmasına imkan verməkdədir [2, s. 219-223]. 2006-cı ildə inflyasiya 8.3% təşkil etmişdir. İnflyasiyanın 77.2%-i monetar, 22.8%-i qeyri-monetar faktorların payına düşür. Müqayisə üçün, 2005-ci ildə monetar faktorların inflyasiyadakı payı 36.5% olmuşdur. Monetar faktorların payının artması pula fiskal tələbin əhəmiyyətli genişlənməsi hesabına baş vermişdir. Mərkəzi Bank ölkənin pul-kredit sisteminin təaliyyətinin tənzimlənməsində açıq bazar əməliyyatları, yenidən maliyyələşdirmə əməliyyatları, lombard və overnayt kreditləşməsi, mərkəzləşdirilmiş kreditlərin verilməsi, məcburi ehtiyat normalarının səviyyəsinə nəzarət kimi alətlərdən istifadə edir. 2006-cı ildə açıq bazar əməliyyatları digər alətlərlə müqayisədə prioritet xarakter almışdır. Pul kütləsinin inflyasyon potensiala malik hissəsini sterilizasiya etmək üçün Mərkəzi Bank özünün qısamüddətli notlarından istifadəni davam etdirmişdir.

2006-cı ildə uçot dərəcəsi 1 dəfə dəyişdirilmiş, iyul ayının 3-də 9%-dən 9.5%-ə yüksəldilmişdir. Uçot kifayət qədər təsirli olmasa da, onun dəyişdirilməsi inflyasiya gözləmələrinin müəyyən qədər azalmasına imkan vermişdir. Pul kütləsinin əsasən xarici faktorların təsiri nəticəsində əhəmiyyətli genişlənməsi şəraitində Mərkəzi Bank yenidənmaliyyələşdirmə əməliyyatlarını pul proqramında nəzərdə tutulandan az həcmdə həyata keçirmişdir [6, s. 22-29].

Mərkəzi Bankın İdarə Heyəti 2006-cı ilin fevralından etibarən müddəti 1 ildən artıq olan depozitlərin məcburi ehtiyata cəlb olunması praktikasının bərpası barədə qərar qəbul etmişdir. 2003-cü ildən etibarən müddəti 1 ildən artıq olan depozitlər üzrə məcburi ehtiyatların 0% səviyyəsində müəyyən edilirdi. Burada əsas məqsəd iqtisadiyyata uzunmüddətli kredit qoyuluşlarının maliyyə mənbələrinin genişləndirilməsindən ibarət olmuşdu [4, s.72-73 ].

Valyuta-kredit siyasətinin alətlərindən biri də valyuta məzənnəsinin tənzimlənməsidir. Mərkəzi Bank valyuta bazarında tələb və təklifi tənzimləmək yolu ilə manatın məzənnəsinə təsir etmişdir. 2006-cı ildə Mərkəzi Bank üzən-tənzimlənən valyuta kursunun tətbiqini davam etdirmişdir [3, s.381]. Bunu obyektiv əsası kimi üzən-tənzimlənən valyuta kursunun tətbiqinin ölkəmizin xarici bazarlarda baş verən iqtisadi böhranlardan, müxtəlif xammalların qiymətlərinin kəskin artıq-azalmasından yarana biləcək neqativ təsirlərinə qarşı güclü sığortalanma vasitəsi kimi çıxış etməsini göstərmək olar. Bundan əlavə üzən-tənzimlənən valyuta kursu mexanizmi Mərkəzi Bank üçün ölkə iqtisadiyyatının pulla təminatı ilə yanaşı, əhəmiyyətli maliyyə kanalı rolunu oynayır. Bu baxımdan da valyuta kursu siyasətinin əsas vəzifəsi manatın məzənnəsinin kəskin, iqtisaditarazlığı pozan tərəddüdlərinin qarşısının alınması, ölkənin qızıl-valyuta ehtiyatlarının tələb edilən səviyyədə saxlanılmasından ibarətdir.

**Nəticə.** Azərbaycan Respublikası BVF-dən 2006-ci ildən kredit almağı dayandırmışdır. Götürdüyü kreditlərin isə əksər hissəsini qaytarmışdır. Bu amil ölkənin maliyyə baxımdan BVF-dən asıllığının qarşısı alınması kimi qiymətləndirilsə də, Azərbaycan BVF ilə əvvəlki kimi sıx əlaqədə deyil. Hətta bəzi məsələlərdə Azərbaycan BVF-nin məsləhətlərinə tam əməl etmir. BVF Azərbaycana dövlət xərclərini dünya bazarında neftin qiymətinin artmasına proprosianal şəkildə birbaşa artırmamağı tövsiyə edir. Bu baxımdan, BVF Azərbaycanı dövlət büdcəsinin neft amili nəzərə alınmadan yaranan kəsirin səviyyəsini ölkənin ÜDM-nin 40%-dən yuxarı qalxmamasına çağırır. Neft Fondundan büdcəyə 2003-cü ildə 100 mln. manat transfert olduğu halda, 2013-cü ildə bu transfert 114 dəfə artırılaraq 11, 350 mlrd. manat olmuşdur. Müqayisə üçün postsovet məkanının əsas neft ölkələrindən biri olan Qazaxıstanda 2013-cü ildə təminatlı transfertin büdcədə payı 25, 5%-dən 18, 6%-ə düşmüşdür. Bütün bunları nəzər alaraq, əsas təklif ondan ibarət olardı ki, BVF tövsiyyələrini rəhbər tutaraq “neftsiz büdcə” tərtib olunmalı və neft sektorunun dövlət büdcəsində payı minimum həddə endirilməlidir.

Bundan əlavə, icra ilə bağlı məsələlər daha çox diqqət ayırmaq. BVF mövcud layihələrin icrasına diqqəti artırmalı və yalnız o halda yeni layihələri nəzərdən keçirməlidir ki, mövcud icra vəziyyəti buna zəmanət versin. Diqqət əsasən mövcud layihələr çərçivəsində nəticələrə nail olmağa yönəldilməlidir. İcra vəziyyətinin əhəmiyyətli dərəcədə ləngidiyi layihələri maliyyə təşkilatı və hökumət ləğv etməyi nəzərdən keçirməlidir ki, daha tez uğurun əldə oluna biləcəyi layihələrə daha yaxşı diqqət yetirsin.

BVF-nin fəaliyyəti kasıb ölkələrin marağına əsaslanmalıdır. Beynəlxalq Valyuta Fondunun göstərdiyi fəaliyyət yalnız güclülərin maraqlarından irəli gələn yox, həm də kasıbların maraqlarını əks etdirməlidir. Beynəlxalq maliyyə təşkilatları kasıb ölkələrdə Yoxsulluğun Azaldılması Strategiyasının həyata keçirərkən bu ölkələri asılı hala salacaq təzyiqlər etməməlidirlər. Milli dövlətlər isə öz növbəsində, yeni layihələri seçərkən əsas proritet sahələrə diqqət ayırmalıdırlar. Məsələn, Azərbaycan beynəlxalq maliyyə təşkilatları ilə kənd təsərrüfatı və ümumiyyətlə qeyri-neft sektoru üzrə əməkdaşlığa can atmalı, bu istiqamətdə yerli istehsalın təşkilinə və ixracın artımına nail olmalıdır. Azərbaycan, eyni zamanda ekoloji layihələrin həyata keçirilməsinə maraqlı olmalıdır. Xüsusilə də, neftlə çirklənmiş ərazilərin reablitasiyası üçün layihələrin maliyyələşdirilməsinə beynəlxalq maliyyə təşkilatlarının diqqətini cəlb etməlidir.

## ƏDƏBİYYAT

1. Abbasov A. H. “Azərbaycanda Maliyyə Bazarının formalaşması və bazar iqtisadiyyatında maliyyə-kredit sisteminin problemləri”. Bakı. 2003. 2. Kərimov C.H., Orucov A.İ., İsrafilov H.A. Dünya iqtisadiyyatı. Bakı, 2009. 3. Kərimov Ə.İ., Kərimov C.Ə. Beynəlxalq İqtisadi Münasibətlər. Bakı, 2006. 4. Məmmədov Z. F. Beynəlxalq valyuta-kredit münasibətləri və xarici ölkələrin pulkredit sistemi. Bakı, 2008. 5. Vəliyev D.Ə., Rəhimov M.S. Beynəlxalq maliyyə. Bakı, 2008. 6. Beynəlxalq Valyuta Fondu və Azərbaycan. Standartlara və Məcəllələrə Riayət üzrə Hesabat (SMRH) - Məlumat modulu (Mərkəzi Bank tərəfindən hazırlanmış və Robert W. Edwards və Mohsin Khan tərəfindən təsdiq edilmişdir). Cild III. Bakı, 2008. 7. www.cbar.az (Azərbaycan Respublikası Mərkəzi Bankının rəsmi internet səhifəsi)

www.imf.org (Beynəlxalq Valyuta Fondunun rəsmi internet səhifəsi)

### Анализ современных отношений между Азербайджанской Республикой И МВФ

**Э. З .Оруджов**

В ходе исследования была изучена динамика взаимоотношений Азербайджанской Республики с Международным валютным фондом после провозглашения Азербайджаном независимости. В течение долгого времени отношения развивались в процветающем направлении. Азербайджан прекратил кредитование МВФ в 2006 году, и он просто продолжал получать консультации по вопросам политики и техническую помощь. Все эти процессы рассматривались как ослабление отношений. В то же время были сделаны определенные предложения о том, чтобы страна извлекла выгоду из обширных возможностей МВФ.

***Ключевые слова:*** *Азербайджан и МВФ, двустороннее сотрудничество, многостороннее сотрудничество, кредитная политика МВФ, экономический рост.*

### Analysıs of modern relatıonshıps between the republıc of azerbaıjan and the ımf

**E.Z.Orujov**

The research studied the dynamics of the relationships of the Republic of Azerbaijan with the International Monetary Fund after Azerbaijan proclaimed its independence. The relationships have grown in a thriving direction for a long time. Azerbaijan stopped lending from IMF in 2006 and it just continued to get policy advice and technical assistance. All these processes were regarded as a weakening of the relationships. At the same time, certain proposals have been made for the country to benefit from the IMF's extensive opportunities.

***Key words:*** *Azerbaijan and IMF, bilateral cooperation, multilateral cooperation, IMF's lending policy, economic growth.*

***e-mail:*** *orujov_2022@yahoo.com*